*AMEA-nın Xəbərləri (biologiya və tibb elmləri), cild 70, №2, səh. 134-139 (2015)*

# Müntəzəm Üslublu Kompozisiyaların Yaradılması

**T.S. Məmmədov[1], A.Ə. Həsənova[2], Ş.A. Gülməmmədova[1*]**

[1]*AMEA Dendrologiya İnstitutu, Mərdəkan qəsəbəsi, S.Yesenin 89, Baku AZ 1044, Azərbaycan;*
**E-mail: shalala.g@mail.ru*
[2] *Azərbaycan Memarlıq və İnşaat Universiteti, A.Sultanova küç. 5, Bakı AZ 1143, Azərbaycan*

**AMEA Dendrologiya İnstitutunda aparılan elmi-tədqiqat işində ilk dəfə olaraq Abşeron şəraitində çiçəkli kompozisiyaların yaradılmasının elmi əsasları tərtıb olunmuşdur. Müəyyən edilmişdir ki, introduksiya olunmuş dekorativ bitkilər Abşeron şəraitinə yaxşı uyğunlaşır və parklarda, xiyabanlarda müxtəlif formalı kompozisiyaların düzəldilməsində istifadə edilə bilər.**

***Açar sözlər:*** *Landşaft, memarlıq, kompozisiya*

## GİRİŞ

Yaşıllaşdırma, park və bağların salınması işinə respublikamızda xüsusi əhəmiyyət verilir. Yaşıllıqlar havanı saflaşdırmaqla, iqlimi mülayimləşdirməklə yanaşı, həm də küçə və binalara xüsusi gözəllik verir, memarlıq elementlərini tamamlayır. Şəhər və kəndlərimizin daha da gözəlləşməsi üçün şəhərsalmanın müasir tələblərinə tam uyğun gələn kompleks şəkildə yeni yaşayış massivlərinin tikilməsi, memarlığın müasir nailiyyətlərindən tam istifadə olunması, milli ənənələrin nəzərə alınması yaşıllıqların salınması ilə birgə aparılmalıdır.

Keçmiş illərin bir çox dekorativ kompozisiyaları müasir şəhərlərin və evlərin yeni tikintilərinə, formalarına uyğun gəlmir, ona görə landşaft memarlığı üslubunda yeni kompozisiyalar yaradılmalı, küçə və parkları bəzəməlidir. Tərtib edilən kompozisiyalar yerli şəraitə uyğun olaraq, milli formada düzəldilməlidir. Bu baxımdan hal-hazırda Abşeronun yaşıllaşdırılmasında istifadə olunan dekorativ bitkilərin yeni növlərlə zənginləşməsinə ehtiyac vardır. Respublikada, xüsusilə Bakı şəhərində son dövrlərdə yeni körpülərin, yolların, yaşayış və sənaye binalarının ətrafında yaradılmış park və bağların yaşıllaşdırılması üçün müxtəlif ölkələrdən introduksiya olunmuş dekorativ bitkilərin istifadəsi genofondun mühafizəsində, biomüxtəlifliyin artırılmasında və ekoloji tarazlığın saxlanılmasında mühüm əhəmiyyətə malikdir.

Azərbaycanın müasir şəhərlərini bağ və parksız, yaşıllaşdırılmış küçə və həyətsiz çətin təsəvvür etmək olar. Yaşıllıqlar mikroiqlimin yaxşılaşdırılması ilə yanaşı, şəhər mühitinin zəruri estetik elementləri kimi də xidmət edir. Şəhər parklarının formalaşması, yaşayış rayonlarının yaşıllaşdırılması mürəkkəb şəhərsalma məsələsidir. Bu məsələnin həlli çox vaxt yararsız ərazilərin mənimsənməsi, pozulmuş landşaftların bərpası və respublikanın müasir şəhərsalma tələblərinə uyğun olan yenilərinin yaradılması zəruriliyi ilə toqquşur (Həsənova, 2006).

Texniki tərəqqi, getdikcə artan sürətlər əsrində bağ elə bir yerdir ki, orada insan şəhərin səs-küyündən, müasir həyatın yorucu təsirindən gizlənə, tək qala bilər. Bağda insan təbiətlə tək qalaraq və yorğunluğunu çıxararaq bir müddət real həyatdan uzaqlaşır. Bağ – əl ilə yaradılmış rahatlıq və dinclik guşəsidir. Uzun müddət bağın təmiz havasında gəzmək, idmanla məşğul olmaq, lazımı fiziki məşğuliyyət əhval-ruhiyyəni yaxşılaşdırmağa, ruh yüksəkliyni saxlamağa, stresi aradan qaldırmağa kömək edir. Bağ öz sahibləri üçün estetik zövq mənbəyidir. Bir çox həvəskar bağçıların məqsədi bağı dinclik yerinə çevirməklə yanaşı ərazi harmoniyası, rəng, forma, qoxuların harmoniyasını yaratmaqdır. Əsl gözəl bağ təsadüfi vəziyyətlər deyil, yaxşı düşünülmüş planlaşmanın nəticəsidir. Hər-hansı planlaşmanın başlanğıcı – ilk növbədə bağın sahiblərinin həyat üslubu ilə bağlı olan yararlı üslubun seçimidir. Dəqiq formaları sevənlər müntəzəm üslubu seçə bilər. Bu üslubun əsasını həndəsi xətlər təşkil edir. Bağın üslubu əsasən evin və digər tikililərin memarlıq xarakteri ilə müəyyən edilir.

Müntəzəm üslub iki əsas prinsipə əsaslanır – simmetriya və dəqiq həndəsəyə. Müntəzəm bağ – dəqiq formalar, düz xətlər, yığcam rəng qamması, gözəllik və zəriflikdir. Ağacların, kolların, çiçəkliklərin, yolların və meydançaların, hovuzların formaları dəqiq xətlərlə əhatə olunan bağ ilin hər-hansı vaxtında gözəl olur. Müntəzəm üslub landşaft dizaynının başlanğıcında durur. Antik dövrün bağ tərtibatlarından başlayaraq Intibah dövrünə keçmiş və XVII-XVIII əsrlərdə İtaliya və Fransada inkişaf etmişdir. Fransanın bağ – park incəsənətinin şah əsərləri müntəzəm üslubun inkişafının zirvəsi olmuşlar. O vaxtın məşhur dizaynerlərindən biri – Andre Le Notr doğma Fransadan başqa Almaniyada, Hollandiyada və digər Avropa ölkələrinin landşaft dizaynı tarixində iz qoymuşdur. Onun la-

yihəsi üzrə yaradılmış Versal parkı dünya bağ – park incəsənətinin mirvarisi hesab edilir və tarixə Fransanın müntəzəm üslubu adı ilə daxil olaraq yeni üslubun başlanğıcını qoymuşdur (Кузнецова, 2010).

Ərazinin yaşıllaşdırma layihəsində bitki assortimentinin seçiminə ciddi diqqət yetirilməlidir. Burada sahənin bütün xüsusiyyətləri (relyef, torpaq və hidroloji şəraitlər, mövcud olan bitkilər), həmçinin bitkilərin sahədə yerləşməsinə uyğun olaraq onların bioloji və dekorativ xüsusiyyətləri maksimal dərəcədə nəzərə alınmalıdır. Müxtəlif yaşıl əkinlərin dəqiq layihələndirilməsi aparılan işlərin çox mühüm və mürəkkəb mərhələsidir. Nəzərə almaq lazımdır ki, bu məsələnin elmi və praktiki cəhətdən həlli şəhərdə müxtəlif kateqoriyalı yaşıl əkinlər üçün tamamilə müxtəlif olur (Маргайлик,1979).

Ağac və kol bitkilərinin bacarıqla seçilməsi, onların əlverişli surətdə yerləşdirilməsi, müxtəlif növ əkin materiallarından istifadə etməklə landşaft kompozisiyalarının yaradılması yaşıllaşdırma işinin müvəffəqiyyətlə başa çatdırılması deməkdir (Məmmədov, 2014 ).

Ağac və kol bitkilərinin çoxluğu hələ park və bağların gözəl olması demək deyildir.

Yaşıllaşdırma zamanı, hər şeydən əvvəl bitkilərin, ağac və kolların dekorativ, bioloji və bəzək xüsusiyyətlərindən bacarıqla istifadə edərək, onların yüksək zövqlə əkilməsinə fikir vermək, bitki qruplarını landşaftı yaxşılaşdırmaq məqsədilə seçmək və memarlıq kompozisiyasından məharətlə istifadə etmək lazımdır ( Məmmədov, 1977).

Bağ-park incəsənətində kompozisiya – sahənin səmərəli və bədii təşkili məqsədi ilə təbii elementlərin, ayrıca komponentlərin harmonik yerləşməsidir. Dekorativ əkinlər – relyef, su ehtiyatları və obyektlərlə birgə sahə strukturu əmələ gətirir (Шешко, 2009).

Kompozisiyanın görünüşü bitkilərin hündürlüyünə, rənginə və formasına görə seçimindən asılıdır. Hündür bitkilər arxa planda yerləşdirilir ki, onlar daha qısa bitkiləri örtməsin. Çiçəklərin rənginə görə seçimində tədricən bir çalardan digərinə keçiddən və ya əksinə, ziddiyyətli çalarların uyğunlaşmasından istifadə edilir (Витвицкая, 2005).

## MATERİAL VƏ METODLAR

Abşeronun yaşıllaşdırılmasında istifadə olunan bitkilərin növ və sort müxtəlifliyinin zənginləşdirilməsi, elmi əsaslarla müxtəlif formalı kompozisiyaların yaradılması məqsədi ilə AMEA Dendrologiya İnstitutunun "Landşaft memarlığı" laboratoriyasında elmi-tədqiqat işi aparılır. Elmi-tədqiqat işinin əsas məqsədi müxtəlif növ və sortlardan ibarət dekorativ ağac, kol və ot bitkilərinin Hollandiya, Amerika, digər ölkələrdən və yerli floradan Abşeron şəraitinə introduksiyası, onların bioekoloji xüsusiyyətlərinin öyrənilməsi və bu bitkilərdən istifadə etməklə parklarda, bağlarda, xiyabanlarda landşaft memarlığı üslubunda müxtəlif formalı kompozisiyaların yaradılmasıdır. Tədqiqat işi yerinə yetirilən zaman bir sıra metodikalardan istifadə edilmişdir. Veğetativ orqanların morfoloji xüsusiyyətləri İ.T.Vasilçenkonun (1979) və İ.Q.Serebryakovun (1952) metodikaları ilə öyrənilmişdir. Bitkilərin böyümə dinamikasını təyin etmək üçün vegetasiya başlanandan qurtarana kimi hər 10 gündən bir müşahidə aparılmışdır. Bitkilər üzərində fenoloji müşahidələr aparmaq məqsədilə N.A.Avrorinin (1953), A.Q.Qolovaçın (1962), F.N.Rusanovun (1970) və Rusiya Baş Botanika Bağının işləyib hazırladıqları metodikalardan istifadə olunmuşdur. Kök sisteminin morfologiyası öyrənilərkən V.A.Kolesnikovun (1971) "köklərin tam çıxarılaraq yuyulması" metodikasından istifadə edilmişdir. Bitkilərin istiyə davamlılığı K.A.Axmatov (1972), R.Moles (1992), L.Mucina (1993), quraqlığa davamlılığı isə P.A.Qenkelin (1956) metodikaları ilə öyrənilmişdir.

## NƏTİCƏLƏR VƏ ONLARIN MÜZAKİRƏSİ

Aparılan elmi-tədqiqat işində açıq sahədə və oranjereya şəraitində introduksiya olunmuş dekorativ bitkilərin bioekoloji xüsusiyyətləri öyrənilmiş, Dendrarinin ərazisində tədqiq olunan bitkilərdən müxtəlif formalı kompozisiyalar düzəldilmişdir.

Hal-hazırda çiçəkliklərin tərtibatında çoxillik bitkilərə böyük diqqət verilir. Soğanaqlı və kök yumrulu bitkilər bu qrupa daxildir. Bu bitkilərə sünbülçiçək, tülpan, nərgiz, qarğasoğanı, zəfəran, zanbaq və s. aiddir. Soğanaqlı və kök yumrulu bitkilər yüksək dekorativ keyfiyyətləri, gözəl, tez çiçəkləməsi ilə fərqlənir və çiçəkliklərin tərtibatında geniş istifadə olunur.

Elmi-tədqiqat işində soğanaqlı və kök yumrulu bitkilərin bioekoloji xüsusiyyətləri öyrənilmiş və kompozisiyaların tərtibatında istifadə edilmişdir.

Soğanaqlı bitkilərin bəzi tədqiq olunan Hollandiya sortlarının fenoloji inkişaf fazaları cədvəl 1-də göstərilmişdir.

Tədqiqat işində kompozisiyalar 2 üslubda düzəldilmişdir: həndəsi formalarla müntəzəm və landşaft və ya mənzərəli üslubda. Müntəzəm üslublu kompozisiyalarda müxtəlif həndəsi formalar, məsələn "Kvadrat", "Romb", "Dairə", "Ulduz", "Düzbucaq" və s. düzəldilmişdir.

**Cədvəl 1.** Bəzi tədqiq olunan sortların fenoloji inkişaf fazaları

| № | Sortların adları | Yarpaq-lama | Qönçə-ləmə | Çiçəkləmə | | Meyvə-nin əmələ gəlməsi | Yarpaq. saralmağa başlaması | Bitkinin yerüstü hissəs. qurum. |
|---|---|---|---|---|---|---|---|---|
| | | | | başl. | qurt. | | | |
| 1 | *Tulipa"Editil NL"* | 16.02 | 03.04 | 12.04 | 30.04 | - | 16.05 | 12.06 |
| 2 | *T."PW Alexind"* | 15.02 | 02.04 | 11.04 | 28.04 | 08.05 | 15.05 | 11.06 |
| 3 | *T."Purk"* | 14.02 | 03.04 | 13.04 | 25.04 | 07.05 | 14.05 | 13.06 |
| 4 | *T."A.Adamkiene"* | 16.02 | 04.04 | 12.04 | 26.04 | - | 16.05 | 14.06 |
| 5 | *T."Bring Blos"* | 15.02 | 03.04 | 11.04 | 25.04 | - | 17.05 | 12.06 |
| 6 | *T."Wit JL"* | 14.02 | 01.04 | 08.04 | 28.04 | - | 15.05 | 13.06 |
| 7 | *T."Bring Bruin"* | 16.02 | 03.04 | 12.04 | 30.04 | 07.05 | 14.05 | 11.06 |
| 8 | *T."Geidar Aliyev"* | 15.02 | 02.04 | 11.04 | 27.04 | 08.05 | 16.05 | 12.06 |
| 9 | *T."Portland"* | 16.02 | 04.04 | 13.04 | 20.04 | 06.05 | 15.05 | 14.06 |
| 10 | *T."Or babu"* | 14.02 | 03.04 | 12.04 | 28.04 | 10.05 | 14.05 | 11.06 |
| 11 | *T."Leila kids and respekt"* | 15.02 | 02.04 | 17.04 | 30.04 | 08.05 | 16.05 | 12.06 |
| 12 | *T."Balerina"* | 16.02 | 04.04 | 12.04 | 29.04 | 07.05 | 15.05 | 12.06 |
| 13 | *T."Red Rover"* | 14.02 | 02.04 | 09.04 | 20.04 | 08.05 | 16.05 | 04.06 |
| 14 | *T."Vespo"* | 15.02 | 03.04 | 12.04 | 30.04 | - | 14.05 | 12.06 |
| 15 | *Hyacinthus"Wood stask"* | 10.02 | 10.03 | 24.03 | 15.04 | - | 13.05 | 29.05 |
| 16 | *H."Sky jaket"* | 11.02 | 13.03 | 27.03 | 11.04 | 22.04 | 12.05 | 27.05 |
| 17 | *H."Amethyus"* | 12.02 | 14.03 | 28.03 | 12.04 | - | 14.05 | 28.05 |
| 18 | *H."Disk wilden"* | 10.02 | 13.03 | 26.03 | 13.04 | 20.04 | 15.05 | 29.05 |
| 19 | *Narcissus"Gemendil"* | 13.02 | 14.03 | 03.04 | 20.04 | - | 14.05 | 27.05 |
| 20 | *N."Carnegie"* | 14.02 | 13.03 | 05.04 | 22.04 | - | 15.05 | 28.05 |



**Şəkil 1.** Dairə forması



**Şəkil 2.** Düzbucaq forması

Dendrarinin ərazisində düzəldilmiş bəzi kompozisiyalar 1-4 saylı şəkillərdə göstərilmişdir.

Kompozisiyanın tərtibatı üçün sahə seçilmiş, onun ölçüləri və forması müəyyən edilmişdir. Sonra torpaq bellənmiş, gübrə verilmiş və hamarlanmışdır. Kompozisiyanın şəkli kağızda çəkilmiş, sonra torpağa köçürülmüşdür. Formaların kənarları tirələrlə əhatə olunmuş, içərisində müxtəlif dekorativ bitkilər əkilmiş və suvarılmışdır. Əkindən sonra ilk həftələrdə tutmamış şitillərin yerinə həmin sort və rəngdən yeni bitkilər əkilmişdir. Bunun üçün 10-25% miqdarında ehtiyat bitkilər becərilmişdir. Vaxtaşırı torpaq yumşaldılmışdır. Bitkilər tutduqdan və böyüməyə başladıqdan sonra torpağa üzvi və ya mineral gübrələr verilmişdir. Solmuş çiçək qrupları və ya çiçəklər kəsilmişdir. Kompozisiyada bitkilər elə yerləşdirilmişdir ki, torpağın üzərini yaşıl xalça kimi tutsunlar. Bitkilərin çiçəkləmə müddəti və xüsusiyyəti nəzərə alınmışdır. Kompozisiyanın layihəsi torpaq-iqlim şəraiti, relyef nəzərə alınmaqla tərtib edilmişdir. Kompozisiyanın tərtibatında əsas prinsiplərdən biri onun formasının seçimidir. Bu forma ətrafdakı ağaclarla, kollarla, tikintilərlə və çəpərlərlə harmoniya təşkil etməli və onları tamamlamalıdır. Kompozisiyanın mərkəzi hissəsində hündür, kənarlarında isə alçaqboylu bit-



**Şəkil 3.** Ulduz forması



**Şəkil 4.** Kvadrat forması

kilər əkilmişdir. Bitkilər seçilərkən onların hündürlüyü, forması, kolun şaxələnməsi, çiçəklərin rəngi, ölçüləri və çiçəkləmə vaxtı nəzərə alınmışdır. Müxtəlif formalı kompozisiyalar elə düzəldilmişdir ki, heykəllərlə, fəvvarələrlə, klassik üslubda memarlıq elementləri ilə yaxşı uyğunlaşsın.

Kompozisiyalarda bitkilərin bioekoloji xüsusiyyətləri və dekorativ əlamətləri nəzərə alınmışdır. Hər il kompozisiyalarda birillik bitkilər digər birillik bitkilərlə əvəz olunur, çoxillik bitkilər isə qalır. Kompozisiyaların mərkəzində əsasən həmişəyaşıl ağac və kollar, ətrafında isə çoxillik və birillik ot bitkiləri əkilmişdir. Bitkilərin kompozisiyada yaxşı böyüməsi və inkişaf etməsi üçün mümkün qədər torpağa, işığa, istiyə və nəmişliyə eyni tələbləri olan bitkilər seçilmişdir. Kompozisiyalarda bitkilər elə seçilmişdir ki, onların çiçəkləməsi eyni vaxtda olsun və ya solmuş bitkilərin yerinə digər bitkilər çiçəkləyərək müntəzəm çiçəkləmə təmin edilsin. Kompozisiyalarda bitkilər hündürlüyünə, rənginə, formasına görə bir-birilə uyğunlaşdırılmışdır. Kompozisiyanın əsas hissələri yaxşı görünən zonalarda, əsasən mərkəzdə yerləşdirilmişdir. Kompozisiyanın əsas hissəsində parlaq rəngli iri güllər əkilmişdir. Kompozisiyalarda dibçəklərdə əkilmiş bitkilərdən də istifadə edilmişdir. Bu cür bitkilərdən istifadə ona görə rahatdır ki, onları acanlıqla dəyişmək, bir yerdən digər yerə keçirmək və s. olar.

Müntəzəm üslublu kompozisiyalarda müxtəlif həmişəyaşıl ağac və kollardan, məsələn, palma, yukka, tuya, küknar, şam, sərv, rozmarinlərdən istifadə edilmişdir. Birillik və çoxillik dekorativ ot bitkiləri kompozisiyaya gözəllik verir. Birillik mövsümü bitkilərdən zinniya, solmazçiçək, sürvə, sabahgülü, xoruzpipiyi və s., çoxillik bitkilərdən əsasən soğanaqlı, kök yumrulu, kökümsovlu bitkilərdən istifadə edilmişdir.

Dendrarinin ərazisində bağın sahibi, neft milyonçusu Murtuza Muxtarovun heykəlinin qarşısında müntəzəm üslublu, səkkiz guşəli, fəvvarəli "Ulduz" forması düzəldilmişdir. Kompozisiyanın mərkəzi hissəsində, hovuzun içərisində fəvvarə yerləşdirilmiş, ulduzun guşələrinin üzərində asparaqus bitkisi, mövsümü güllər, ulduzun ətrafında sinerariya kolları əkilmişdir. Kompozisiyanın ətrafında bordyur düzəldilmişdir (şəkil 3).

Park, bağ, bulvar və küçələrin salınmasında kiçik memarlıq formaları – fəvvarələr, hovuzlar, abidələr, güldanlar, pilləkənlər və s. əsas yerlərdən birini tutur. Kiçik memarlıq formaları ilə landşaft elementləri bir-birini tamamlayaraq bu və ya digər memarlıq ansamblını yaradırlar.

Hal-hazırda respublikamızın park, bağ, xiyaban, bulvarlarında müntəzəm üslublu kompozisiyalara geniş yer verilir. Bu kompozisiyalar dəqiq həndəsi formaları, öz gözəllikləri ilə şəhər və rayonlarımızı bəzəyir.

Hər il 10 mayda Bakı şəhərində və rayonlarımızda keçirilən gül bayramında Respublika Sarayının qarşısında, parklarda, bulvarda müntəzəm üslublu müxtəlif formalı kompozisiyalar yaradılır. Bu bayrama xarici ölkələrdən, yerli floradan müxtəlif növ bitkilər gətirilir və kompozisiyaların tərtibatında istifadə edilir.

Dendrologiya İnstitutunda aparılan elmi-tədqiqat işində introduksiya olunmuş bəzi dekorativ

ağac, kol və ot bitkilərinin Abşeron şəraitində bioekoloji xüsusiyyətləri öyrənilmiş, müxtəlif formalı kompozisiyaların düzəldilməsinin elmi əsasları tərtıb olunmuşdur.

Müəyyən edilmişdir ki, müxtəlif ölkələrdən və yerli floradan introduksiya olunmuş dekorativ bitkilər Abşeron şəraitinə yaxşı uyğunlaşır, perspektivlidir və parkların, bağların tərtibatında, müxtəlif formalı kompozisiyaların düzəldilməsində istifadə edilə bilər.

## ƏDƏBİYYAT

**Həsənova A.Ə.** (2006) Azərbaycanın landşaft memarlığı. Bakı: Əbilov, Zeynalov və oğulları, 212s.

**Məmmədov F.** (1977) Yaşıl çəpərlər. Bakı: Azərbaycan Dövlət Nəşriyyatı, s. 3-5.

**Məmmədov T.S.** (2004) Ekoloji amillərə görə Abşeronda yaşıllaşdırma. Bakı: Elm, 9 s.

**Аврорин Н.А.** (1953) Акклиматизация и фенология. *Бюлл. ГБС АН СССР*, **вып. 16:** 8-11

**Ахматов К.А.** (1972) Полевой метод определения жароустойчивости растений. *Бюлл. ГБС АН СССР,* **вып. 86:** 73-74

**Васильченко И.Т. (**1979) Определитель всходов сорных растений. Ленинград: Колос, с.181-182.

**Витвицкая М.Э.** (2005) Современный дизайн участка. Москва: ЛАДА, 207 с.

**Генкель П.А.** (1956) Диагностика засухоустойчивости культурных растений и способы её повышения. *Методические указания.* Москва: АН СССР, 69 с.

**Головач А.Г.** (1962) Декоративные и другие полезные растения в природе и культуре. М.-Л.: АН СССР, с. 39-98.

**Колесников В.А.** (1971) Методы изучения корневой системы древесных растений. М.: Лесная промышленность: 152 с.

**Кузнецова Н.В.** (2010) Ландшафтный дизайн вашего участка. Москва: ОЛМА Медиа Групп, 110 с.

**Маргайлик Т.И.** (1979) Справочник озеленителя. Минск: Полымя, 7 с.

**Русанов Ф.Н.** (1970**).** Вопросы, разрешаемые при изучении интродуцированных растений. Академия Наук Узбекской ССР. *Ботанический Сад. «Интродукция и акклиматизация растений».* **Вып. 7.** Ташкент: ФАН, с. 187-194.

**Серябряков И.Г.** (1952) Морфология вегетативных органов высших растений. М.: Советская наука, с. 293.

**Шешко П.С.** (2009) Ландшафтный дизайн. Минск: Современная школа, 71 с.

**Moles R.** (1992) Trampling damage to vegetation and soil cover at patwithin Burren National Park, Mullach mor, Co Clare. *Irish Geogr.,* **25 (2):** 129.

**Mucina L., Grabherr G., Ellmauer T.** (1993) Die Pflanzen gesell schaften Oster reichs. *Teil Jena, G.F.V.*, **55:** 490.

### Создание Композиций Регулярного Стиля

**Т.С. Мамедов, А.А.Гасанова, Ш.А. Гюльмамедова**

*Институт дендрологии НАНА*

Проведенной в Институте Дендрологии НАН Азербайджана научно-исследовательской работе, впервые в условиях Абшерона разработаны научные основы создания цветочных композиций. Было выявлено, что интродуцированные декоративные растения хорошо адаптируются в условиях Абшерона и рекомендуются для использования при создании различных композиций в парках и скверах.

***Ключевые слова:*** *Ландшафт, архитектура, композиция*

**Creation of Compositions of Regular Style**

**T.S.Mammadov, A.A. Gasanova, Sh.A. Gulmammadova**

*Institute of Dendrology, ANAS*

The scientific basis of creating floral compositions was developed for the first time under climatic conditions of Absheron as a result of the research conducted at the Institute of Dendrology, ANAS. It was established that the introduced plants from different countries and ornamental plants from the local flora were well adapted under the Absheron climatic conditions and they were recommended for the creation of various compositions in parks, squares.

***Key words:*** *Landscape, architecture, composition*